

# HƏNƏFİ MƏZHƏBİ

## YARANDIĞI ZƏMİN, TƏŞƏKKÜLÜNƏ TƏ'SİR EDƏN SİMALAR VƏ YAZILMA ŞƏKLİ

***Rüstəm Mehdi***
*2 məhərrəm, 1443*
*10 avqust, 2021*

Hər məzhəbin yarandığı zəmin, onun təşəkkülünə tə'sir edən simalar və yazılma şəkli, o məzhəbi tanımaq üçün vacib rol oynayır. İslamın ən qədim məzhəblərindən sayılan Hənəfi məzhəbi haqda da eyni şey keçərlidir.

### HƏNƏFİ MƏZHƏBİNİN YARANDIĞI ZƏMİN



Məzhəbin yarandığı zəmin olan Kufə şəhəri, digər İslam diyarlarına nisbətdə daha fərqli bir yer olduğu kimi, Hənəfi məzhəbinin qurucuları sayılan və Əbu Hənifənin sədarəti altında bu işdə iştirak edən müctəhidlərdən mütəşəkkil elmi hey'ət də o dövrün müstəsna fəqihləri idi. Bu da məzhəbin yazılma tərzinə bilavasitə tə'sir göstərmişdi.

Kufə şəhərinin elmi mövqeyi barədə mə'lumat qazanmaq, bu şəhərdə yaranan Hənəfi məzhəbi haqda doğru təsəvvürə sahib olmaq üçün zəruridir. Bu səbəbdən İmam Məhəmməd Zahid əl-Kövsəri *«Fiqh əhlil-İraq və hədisuhum»* kitabında[1] bu haqda xüsusi fəsildə danışmışdır.

Kufə şəhəri qədim zamanlarda islami elmlərin mərkəzi olmaqla seçilən bir şəhər idi. Yeddi mütəvatir qiraət imamlarından üçünün, Asim ibn Əbun-Nəcud, Həmzə ibn Həbib və Əli ibn Həmzə əl-Kisainin Kufə imamları olması, bu şəhərin Qur'ani-Kərim elmlərində nə qədər inkişaf etdiyinin ən bariz nümunəsidir.

Kufənin ərəb dilçiliyindəki rolu da danılmazdır. Məşhur iki dilçilik məzhəbinin biri məhz Kufə, digəri isə Bəsrə məzhəbidir. Bu da Kufənin, ümumiyyətlə İraqın ərəb dilçiliyində nə qədər vacib yerə sahib olduğunu göstərir.

Məhəmməd Zahid əl-Kövsəri bu dilçilik məzhəbləri haqda belə deyir: *«Kufə və Bəsrəyə gəlincə, ərəb dili elə bu iki şəhərdə tədvin edilmişdir. Kufəli dilçilərin əsas vəzifəsi, Qur'an və sünnətin əsrarına, fərqli*

---

[1] Bu əslində İmam əl-Kövsərinin *«Nasbur-rayə»* kitabına yazdığı müqəddiməsidir, daha sonra müstəqil kitab halında *«Fiqh əhlil-İraq və hədisuhum»* adı altında çap edilmişdir. Kitab 2016-cı ildə bizim tərcüməylə azərbaycanca pdf olaraq yayınlanmışdır. İnşallah bu yaxınlarda gözdən keçirdikdən sonra yenidən yayınlayacağıq.

*qiraətlərin ifadə etdiyi mə'nalara vaqif olmaq üçün, vəhyin nazil olduğu dövrə aid ərəb ləhcələrini cəm etmək idi. Bəsrə dilçiləri isə, bu fərqli ləhcələr arasından «gələcəyin dili» olmaq üçün ən münasib ləhcələri seçməklə məşğul idi. Hər iki vəzifə bir-birinə möhtacdır.»* [əl-Kövsəri, *«Fiqh əhlil-İraq və hədisuhum»*, 52.]

Hədisə gəlincə, məşhur, lakin yanlış düşüncəyə görə o dövrlərdə İraq, Hicaza nisbətdə hədislərin az olduğu bir diyar idi. Hətta bu iddia sahiblərinə görə hənəfilərin «əhli-rəy» adlanmasının səbəbi, İraqın, xüsusilə Kufənin hədisdən yoxsul olması idi. Bu düşüncənin yanlış olduğunu görmək üçün, Kufənin salındığı gündən e'tibarən nə cür bir şəhər olduğuna nəzər salmaq kifayətdir.

İmam Əhməd ibn Abdullah əl-İcli, təkcə Kufə şəhərinə min beş yüz əshabə gəldiyini qeyd edir. [əl-İcli, *«Mə'rifətus-siqat»*, II, 448] İmam əl-Kövsəri, əl-İclinin bu sözünü qeyd etdikdən sonra belə deyir: *«Onların yetmişə yaxını Bədr müharibəsində iştirak etmiş əshabələrdir. Üstəlik bu say, Kufədə yaşayıb elm yaydıqdan sonra başqa şəhərlərə köçənlərdən əlavə, sırf Kufədə qalan əshabələrin sayıdır.»* [əl-Kövsəri, *«Fiqh əhlil-İraq və hədisuhum»*, 42.]

Təbii ki, bu əshabələr —yaxud əksəriyyəti- Peyğəmbərimizdən eşidib gördüklərini rəvayət edirdilər, bu isə hələ onların dövründə Kufənin hədislə dolu bir diyar olduğunu göstərir.

Qazı əl-Həsən ibn Əbdürrəhman ər-Ramhurmuzi sənədi ilə Məhəmməd ibn Sirinin belə dediyini rəvayət edir: *«Deyrül-Cəmacim döyüşündən əvvəl Kufəyə getmişdim. Orada dörd min nəfər hədislə məşğul idi.»* Onun qardaşı Ənəs ibn Sirin isə belə deyir: *«Kufə şəhərinə getdiyim vaxt, orada dörd min nəfərin hədislə məşğul olduğunu görmüşdim. Onlardan dörd yüzü artıq fəqih idi.»* [ər-Ramhurmuzi, *«əl-Muhəddisul-fasil beynər-ravi vəl-vai»*, 560]

O dövrlərdə Kufə şəhəri indiki qədər böyük deyildi. Yeni salınmış bir şəhərdə dörd min nəfər hədislə məşğul olurdusa və bu İraqın təkcə bir şəhərində idisə İraqda hədisin az olduğunu kim iddia edə bilər?

Hətta İmam Əbu Hənifədən sonra belə Kufə şəhəri bu sahədə öz mövqeyini qoruyurdu. Əhməd ibn Hənbəlin şeyxlərindən Affan ibn Müslim belə deyir: *«Kufəyə gedib orada dörd ay qaldıq, istəsəydik o şəhərdə yüz min hədis yazardıq, lakin əlli min hədis yazdıq; yalnız bizə hədis imla edənlərin hədislərini yazırdıq.»* [ər-Ramhurmuzi, *«əl-Muhəddisul-fasil beynər-ravi vəl-vai»*, 559]

Affanın bu sözünü qeyd etdikdən sonra, əl-Kövsərinin təsbitini qeyd etməyə dəyər: *«Affan kimi biri, dörd aya aram-aram yazmaqla əlli min hədis yazmışdı. Halbuki Əhmədin «əl-Müsnəd»indəki hədislər bu saydan xeyli azdır. Belə bir şəhərin az hədisli bir diyar olduğunu iddia etmək necə mümkün ola bilər?»* [əl-Kövsəri, *«Fiqh əhlil-İraq və hədisuhum»*, 51.]

Əhməd ibn Hənbəlin özü belə, İraq fiqhinin təmsilçiləri olan hənəfilərin xeyli hədis bildiklərini e'tiraf edirdi. Tələbəsi İbn Hani, Əhməd ibn Hənbəlin belə dediyini rəvayət edir: *«Rəy əshabını tərk etdik, baxmayaraq ki, xeyli hədis bilirdilər...»* [İbn Hani, *«Məsailul-imam Əhməd ibn Hənbəl»*, II, 168]

Bütün bunlar onu göstərir ki, nə iddia edildiyi kimi İraqda hədislər az idi, nə də İraq fiqhinin təmsilçiləri olan hənəfi imamların hədis elmi zəif idi.

Hənəfilərin «əhli-rəy» adlanmasına gəlincə, əvvəlcə «rəy» sözünün elmi bir istilah (termin) olaraq nə mə'naya gəldiyini bilmək lazımdır. Alimlərin istifadə etdiyi istilahda «rəy» sözü «fiqh» sözünün sinonimidir və əslində təkcə Hənəfi məzhəbinin alimlərinə xas deyil. Bu səbəbdən hicri III əsrdə yaşamış İbn Quteybə əd-Dinəvəri, qələmə aldığı *«əl-Məarif»* kitabında «Rəy əshabı» adı altında səkkiz nəfər alimin adını qeyd edir: İbn Əbu Leyla, Əbu Hənifə, Rabiə ibn Fərrux, Zufər ibn əl-Huzeyl, əl-Əvzai, Sufyan əs-Sövri, Malik ibn Ənəs, Əbu Yusif, Məhəmməd ibn əl-Həsən əş-Şeybani. [İbn Quteybə, *«əl-Məarif»*, 248-251]

Bu adı sadalanan fəqihlərdən Əbu Hənifə, Zufər ibn əl-Huzeyl, Əbu Yusif və Məhəmməd ibn əl-Həsəndən başqa heç birinin Hənəfi məzhəbilə əlaqəsi yoxdur. Malik ibn Ənəs Hicazda qurulmuş Maliki məzhəbinin imamıdır. Rabiə də onun mədinəli şeyxidir. İbn Əbu Leyla, əl-Əvzai, və Sufyan əs-Sövri isə ümumiyyətlə Əbu Hənifəyə qarşı düşmənçilikləriylə məşhur şəxslər idi. Əgər Hənəfilərin «rəy əshabı» adlanma səbəbi iddia edildiyi kimi İraqdakı hədis azlığı idisə, bəs görəsən Mədinə alimlərindən Rabiə ibn Fərrux və Malik ibn Ənəsin, Şam alimlərindən əl-Əvzainin adı «rəy əshabı» arasında niyə qeyd edilirdi?

Cavab sadədir: Çünki bu alimlər fiqhləri ilə məşhur idilər, alimlər qatında «rəy» termini isə «fiqh» sözünün sinonimidir.

Hənəfi məzhəbinin böyük alimlərindən İmam Nuseyr ibn Yəhya əl-Bəlxi ilə İmam Əhməd ibn Hənbəl arasında keçən dialoq bunun ən bariz dəlilidir. İmam İbn Əbul-Avvam «*Fədail Əbi Hənifə*» kitabının «Elminin və fəhminin çoxluğu səbəbiylə Əbu Hənifəyə həsəd və tə'nə edilməsi» adlı bölümdə belə rəvayət edir: «*Nuseyr ibn Yəhya əl-Bəlxi belə dedi: Əhməd ibn Hənbələ dedim:*

*- Bu şəxsdə (Əbu Hənifədə) xoşuna gəlməyən nə var?*

*- Rəy.*

*- Məgər Malik ibn Ənəs rəy sahibi olmayıb?*

*- Olub, lakin Əbu Hənifənin rəyi kitablarda qeyd edildiyi üçün əbədi qalacaq.*

*- Malik ibn Ənəsin də rəyi kitablarda qeyd edilərək əbədiləşdirilib.*

*- Əbu Hənifə Malikdən daha çox rəy ortaya qoyub.*

*- O zaman nəyə görə Əbu Hənifənin rəyi qədər ona tə'nə etdiyin kimi, Malikin də rəyi qədər ona tə'nə etmirsən?*

*Bu sözümdən sonra Əhməd susdu.»* [İbn Əbul-Avvam, «*Fədail Əbi Hənifə*», 77.]

Əhməd ibn Hənbəl kimi fiqh kitablarının yazılmasına və oxunmasına qarşı olacaq qədər[2] rəydən uzaq bir imam belə, rəyin təkcə Əbu Hənifəyə xas olmadığını, Malikin də rəy əhlindən olduğunu e'tiraf edir.

Nəinki İmam Malik, ümumiyyətlə bütün fəqihlər rəy əhli hesab edilir. İmam əl-Kövsəri bu haqda belə deyir: «*Bu mə'nada (elmi-istilahi mə'nada) rəy, hər fəqihin sahib olduğu, onun fəhminin itiliyini və fiqhi incəliklərə dalmadakı məharətini göstərən üstün bir xüsusiyyətdir. Bu səbəbdən İbn Quteybə «əl-Məarif» kitabında fəqihləri «rəy əshabı» adı altında qeyd edərək, əl-Əvzai, Sufyan əs-Sövri və Malik ibn Ənəsi də –Allah hamısından razı olsun- bu ad altında təqdim edir.*

*Hafiz Məhəmməd ibn əl-Haris əl-Xuşəni də «Qudat Qurtuba» əsərində Malikin əshabını «rəy əshabı» adı altında təqdim edir. Eyni şeyi Hafiz Əbul-Vəlid ibn əl-Fəradi haqqında da demək olar, o da «Tərix uləmənil-Əndəlus» kitabında eyni yolu izləyir.*[3]

*Həmçinin Hafiz Əbul-Vəlid əl-Baci, «əl-Muvatta» kitabında keçən «sağalmaz xəstəlik» hədisini şərh edərkən, bə'zi ravilərin «sağalmaz xəstəlik» sözünə şərh olaraq Malikdən rəvayət etdikləri şeyə rəddiyə verərək belə deyir: «İbn Əbdülbərr qeyd edir ki, bu şərhi Malikin əshabından olan rəy əhlindən heç kəs ondan rəvayət etmə-*

[2] Hənbəli məzhəbi alimlərindən İmam İbn əl-Cövzi, «*Mənaqibul-imam Əhməd ibn Hənbəl*» kitabında «İnsanlar hədislərin nəqlinə yönəlsin deyə, rəy (fiqh) əhatə edən kitabların yazılmasına qarşı olması» adlı xüsusi bölüm açaraq, sənədilə Əhməd İbn Hənbəldən bu haqda sözlər rəvayət edir. Bu rəvayətlərə nəzər saldığımız zaman görürük ki, Əhməd ibn Hənbəl insanların hətta Malik, Sufyan, əş-Şafei, İshaq ibn Rahaveyh, Əbu Ubeyd və Əbu Sövr kimi alimlərin belə kitablarını oxumalarını istəmirdi. [Bax: İbn əl-Cövzi, «*Mənaqibul-imam Əhməd ibn Hənbəl*», 263-264.] Bu onu göstərir ki, Əhməd ibn Hənbələ görə bu alimlər də rəy əshabından idi.

[3] İbn əl-Fəradi «*Tərix uləməil-Əndəlus*» kitabının müqəddiməsində belə deyir: «Bu kitabda məqsədimiz alimlərin adlarını, künyələrini və nəsəblərini qeyd etmək, kimin rəy əzbərində mahir olduğunu, kimin də hədis rəvayətilə tanındığını qeyd etməkdir...» [İbn əl-Fəradi, «*Tərix uləməil-Əndəlus*», I, 31.] Burada «rəy» deyərkən fiqhdə mahir olanları qəsd edir.

*mişdir.» Burada «rəy əhli» deyərkən Malikin əshabından olan fiqh əhlini qəsd edir.*

*Bu haqda misalları çoxaltmaq mümkündür, lakin buna ehtiyac hiss etmirik.»* [əl-Kövsəri, «*Fiqh əhlil-İraq və hədisuhum*», 17]

Hənəfilərin «rəy əhli» olaraq daha çox yad edilməsi isə, əl-Kövsərinin də qeyd etdiyi kimi, onların ictihad işində daha mahir olmasından qaynaqlanır.

Kufə şəhərinin sahib olduğu bu elmi sərvətlər, orada yetişən fəqihlərin də digər diyarlarda olan fəqihlərdən daha güclü olmasına şərait yaratmışdır. Məkkə fəqihlərindən Əta ibn Əbu Rabəh: *«Elm bizə Kufədən başqa bir yerdən gəlmir.»* - deyərkən yanılmırdı. [İbn Sa'd, «*ət-Tabaqatul-kəbir*», VIII, 133.

**MƏZHƏBİN TƏŞƏKKÜLÜNƏ TƏ'SİR EDƏN SİMALAR**



İslam dünyasında əvəzedilməz rola sahib olan Kufə fəqihləri, Hənəfi məzhəbinin üstün təşəkkülündə rolu olan digər amildir. Bu fəqihlərdən iki başlıq altında danışmaq mümkündür: Əshabə dövründən Əbu Hənifəyə qədər gəlmiş elmi silsilə və Əbu Hənifənin tələbələri.

**Əshabə dövründən Əbu Hənifəyə qədər gəlmiş elmi silsilə.**

*İbn Məs'ud və Əli.* Əmirəlmö'minin Ömər ibn əl-Xattabın (Allah ondan razı olsun) fərmanıyla hicrətin XVII ilində təməli atılan Kufə şəhərində tə'lim-tərbiyə vəzifəsi əshabələrin fəqihlərindən Abdullah ibn Məs'uda həvalə edilmişdi. İbn Məs'ud, elmi bilavasitə Peyğəmbərimizin şahidliyi ilə təzkiyə edilmiş bir fəqihdir: ***«Qur'ani-Kərimi nazil olduğu kimi düzgün oxumaq istəyən qoy İbn Məs'udun oxuduğu kimi oxusun.»*** [ət-Tahavi, «*Şərh muşkilil-əsar*», XIV, 232] ***«Qur'ani-Kərimi dörd nəfərdən öyrənin: Abdullah ibn Məs'ud Əbu Huzeyfənin azadlısı Salim, Ubeyy ibn Ka'b və Muaz ibn Cəbəldən.»*** [əl-Buxari, «*Sahihul-Buxari*», rəvayət № 3758]

Bu səbəbdən Ömər ibn əl-Xattab onu Kufəyə göndərərkən, oraya yerləşmiş müsəlmanlara göndərdiyi məktubda belə yazırdı: *«Mən sizə Ammar ibn Yasiri əmir, İbn Məs'udu isə müəllim və (Ammara) vəzir olaraq göndərirəm. Onlar Məhəmmədin (ona Allahın salamı olsun) əshabələrindən, Bədr döyüşündə iştirak etmiş nəcib şəxslərdir. Onlara tabe olun, sözlərinə qulaq asın. Bilin ki, Abdullah ibn Məs'udu sizin aranıza göndərməklə sizi özümdən üstün tutmuş sayılıram.»* [İbn Sa'd, «*ət-Tabaqatul-kəbir*», VIII, 131.]

İbn Məs'ud, ona tapşırılan bu vəzifənin öhtəsindən layiqincə gəlmiş və Kufə şəhərini alimlərlə doldurmuşdu. Hətta Əmirəlmö'minin Əli ibn Əbu Talib (Allah ondan razı olsun) Kufəyə köçdükdə buna şahid olmuş və *«İbn Məs'udun əshabı bu şəhərin nurlarıdır.»* - demişdir. [İbn Sa'd, «*ət-Tabaqatul-kəbir*», VIII, 132.]

Əlinin Kufə köçməsiylə İbn Məs'udun əshabı (o zamanlar artıq İbn Məs'ud vəfat etmişdi) onun elmindən faydalanmış, beləcə Əli ilə bu alim tələbələr arasında xüsusi münasibət yaranmışdı. İmamla tələbələr arasında əlaqə o qədər güclənmişdi ki, Muğira ibn Miqsəmin də qeyd etdiyi kimi: *«İnsanlara görə Əlidən ən doğru rəvayət edənlər (onun haqda ən çox mə'lumata sahib olanlar) İbn Məs'udun tələbələri idi.»* [İbn Sa'd, «*ət-Tabaqatul-kəbir*», VIII, 133.]

İbn Məs'udla Əlinin elmini cəm edən bu alim simalar nəinki İraqın, hətta İslam coğrafiyasının ən böyük fəqihləri hesab edilirdi. Əlinin və İbn Məs'udun tələbələri başqa necə olmalı idi? Axı Məsruq ibn əl-Əcda'nın da qeyd etdiyi kimi: *«Əshabələrin elmi Əliylə İbn Məs'udda cəm edilmişdi.»* [İbn Sa'd, «*ət-Tabaqatul-kəbir*», II, 303.]

Amir əş-Şa'bi bu iki böyük əshabənin tələbələrini belə vəsf edirdi: *«Kufəyə gə-*

*lən əshabələr arasında*[4] *İbn Məs'udun tələbələri səviyyəsində fəqih tələbələrə sahib heç kəs yoxdur. Peyğəmbərin əshabələrindən sonra İbn Məs'udun tələbələri qədər mülayim, onlar qədər alim, onlar qədər haqsız yerə qan tökməkdən uzaq duran heç kəs yoxdur.»* [İbn Sa'd, *«ət-Tabaqatul-kəbir»*, VIII, 134.]

İbn Məs'udun tələbələri təkcə ondan eşitdikləri şeyləri hafizələrində saxlamaqla kifayətlənmir, onun fətvalarını və məzhəbini təhrir edərək nəql edirdilər. İbn Cərir ət-Təbəri bu haqda belə deyir: *«(Əshabələr arasında) İbn Məs'ud qədər fətvalarını və fiqhi görüşlərini təhrir edən tanınmış tələbələrə sahib başqa heç kəs yoxdur.»* [Bax: İbn Qayyim əl-Cövziyyə, *«İ'lamul-muvaqqi'in»*, I, 20.]

*Alqamə ibn Qeys.* İbn Məs'ud və Əlidən sonra Kufə fiqhinin təmsilçisi, bu tələbələr arasında ən güclüsü, ümmətin rabbani imamı Alqamə ibn Qeys ən-Nəxai idi. Bu zat nəinki İbn Məs'udun tələbələri arasında elminin gücü ilə seçilirdi, hətta davranışı və əxlaqı da İbn Məs'uda bənzəyirdi. Tələbəsi İbrahim ən-Nəxai bu haqda belə deyir: *«İbn Məs'udu tərzində və davranışında Peyğəmbərimizə (ona Allahın salamı olsun), Alqaməni isə İbn Məs'uda bənzədirdilər.»* [İbn Sa'd, *«ət-Tabaqatul-kəbir»*, VIII, 207.]

İbn Məs'uda bağlı olduğu qədər Əliyə də bağlı olan Alqamə, Sıffin döyüşündə Əlinin ordusunda yerini almış və tələbəsi İbrahim ən-Nəxainin də dediyi kimi: *«Qılıncını qanla boyayıncaya qədər döyüşmüş, ayağından yaralanaraq topal qalmış və çox namaz qıldığı üçün «Namaz Ubeyyi» ləqəbiylə məşhur olan qardaşı Ubeyy ibn Qeysi itirmişdi.»* [İbn Sa'd, *«ət-Tabaqatul-kəbir»*, VIII, 209.] Bu səbəbdən İbrahim ən-Nəxaiyə «Alqamə daha fəzilətli idi yoxsa əl-Əsvəd?» - deyə soruşduqları zaman belə demişdi: *«Alqamə daha fəzilətlidir, o ki Sıffin döyüşündə iştirak etmişdir.»* [İbn Sa'd, *«ət-Tabaqatul-kəbir»*, VIII, 211.]

Alqamə ibn Qeys, İbn Məs'ud və Əlidən başqa Ömər, Osman, Əbud-Dərda, Ammar ibn Yasir və Aişə kimi (Allah hamısından razı olsun) böyük səhabələrin elmindən də faydalanmışdır. Möminlərin anası Aişə ilə aralarında isə, Əbu Mə'şərin də qeyd etdiyi kimi qarşılıqlı və xüsusi hörmət var idi. [İbn Sa'd, *«ət-Tabaqatul-kəbir»*, VIII, 390.]

Alqamə ibn Qeysdən fətva soruşan əshabələr belə var idi. Qabus ibn Əbu Zibyan belə deyir: *«Atama dedim: Peyğəmbərin (ona Allahın salamı olsun) əshabı qala-qala nəyə görə Alqamənin yanına gedib ona sual verirdin? Atam belə cavab verdi: Çünki Peyğəmbərin əshabələrinin də ona sual verdiyini və ondan fətva istədiklərini görürdüm.»* [Əbu Nueym, *«Hilyətul-övliya»*, II, 98]

Müəllimi Abdullah ibn Məs'ud, Alqamənin elmini bu sözüylə təzkiyə etmişdir: *«Mən nə bilirəmsə Alqamə də onu bilir, vallahi o, sizin aranızda Qur'anı ən yaxşı biləninizdir.»* [Əbu Nueym, *«Hilyətul-övliya»*, II, 99]

Təbii ki, o dövrdə Qur'ani-Kərimi ən yaxşı bilmək, təkcə onu düzgün oxumaq demək deyil, həm də başda Qur'an olmaqla din elmlərində dərin savad sahibi olmaq demək idi.

*İbrahim ən-Nəxai.* Alqamə ibn Qeysdən sonra Kufə fiqhinin təmsilçisi, Alqamənin ən güclü tələbəsi İbrahim ən-Nəxai oldu. Amir əş-Şa'binin də dediyi kimi o dövrdə *«nə Kufədə, nə Bəsrədə, nə Şamda, nə də Hicazda İbrahim kimi biri var idi.»* [İbn Sa'd, *«ət-Tabaqatul-kəbir»*, VIII, 401.]

İbrahim ən-Nəxai İraq fiqhində, xüsusilə İmam Əbu Hənifənin elmi həyatında olduqca vacib simalardandır. İmam əl-Kövsərinin də qeyd etdiyi kimi: *«Əbu Hənifə mənhəc olaraq Əli və İbn Məs'udun (Allah hər ikisindən razı olsun) tələbələrinin və bu tələbələrdən dərs almış İraq*

---

[4] Bir rəvayətdə isə ümumiyyətlə səhabələr arasında İbn Məs'udun tələbələri kimi fəqih tələbələrə sahib başqa bir səhabə olmadığını qeyd edir.

*alimlərinin, xüsusilə İbrahim ən-Nəxainin yolunu izləmişdir.»* [əl-Kövsəri, *«Husnut-təqadi fi siratil-imam Əbi Yusuf əl-qadi»*, 26]

Əbu Hənifənin rəvayətlərindən ibarət *«əl-Əsar»* kitablarında İbrahim ən-Nəxaidən gələn fətvaların çoxluğu da məhz bundan qaynaqlanır.

*Həmmad ibn Əbu Süleyman.* Əbu Hənifənin müəllimi olan Həmmad, İbrahimin tələbələri arasında fiqhinin gücü ilə seçilirdi. Bu səbəbdən Muğira ibn Miqsəm, İbrahim ən-Nəxaidən: *«Sən vəfat etdikdən sonra kimdən elm alaq?»* - deyə soruşduğu zaman İbrahim: *«Həmmaddan»* - demişdi. [İbn Sa'd, *«ət-Tabaqatul-kəbir»*, VIII, 452.]

Həmmad, İbrahim ən-Nəxaidən o qədər çox elm almışdır ki, təkcə onun İbrahimə verdiyi suallar başqa tələbələrin hamısının verdiyi suallar qədər idi. Bu səbəbdən İbrahim ən-Nəxai, Muğira ibn Miqsəmə belə demişdi: *«Həmmaddan bərk yapışın, o, hər kəsin verdiyi sualları tək başına mənə verib cavabını öyrənmişdir.»* [əz-Zəhəbi, *«Siyər ə'lamin-nubələ»*, V, 232]

Şeyxi İbrahimin zamanında artıq Həmmad ibn Əbu Süleymanın fətva məclisləri var idi. Muğira ibn Miqsəm bu vəziyyəti İbrahim ən-Nəxaiyə bildirdiyi zaman aldığı cavab belə idi: *«Onun fətva verməsinə nə əngəl var? Sən, onun məndən öyrəndiyi məsələlərin ondabirini belə soruşmamısan.»* [əz-Zəhəbi, *«Siyər ə'lamin-nubələ»*, V, 234]

Həm əl-İclinin, həm də əz-Zəhəbinin dediyi kimi, Həmmad İbrahim ən-Nəxainin tələbələri arasında fiqhi ən güclü olan birisidir. [əl-İcli, *«Mə'rifətus-siqat»*, I, 320; əz-Zəhəbi, *«Siyər ə'lamin-nubələ»*, V, 236.]

Həmmad, elmi qədər təqvasıyla da tanınmış bir alimdir. Əbu Ğassən Malik ibn İsmayıl ən-Nəhdi anasının (anası Həmmadın nəvəsidir) belə dediyini rəvayət edir: *«Bə'zən babam Həmmadın, qucağında tutub oxuduğu Qur'ani-Kərimin vərəqlərini göz yaşıyla islatdığını gördüm.»* [İbn Sa'd, *«ət-Tabaqatul-kəbir»*, VIII, 452.]

Əbu Hənifə ilə Həmmad arasındakı dərin bağlılıq, müəllim-tələbə münasibətindən daha böyük bir bağlılıq idi. İmam Əbu Məhəmməd əl-Harisi, sənədi ilə Həmmadın oğlu İsmayılın belə dediyini rəvayət edir: *«Atam Həmmadla Vasit şəhərində idik. Kufədə atamın həddən artıq sevdiyi az yaşlı bir oğlum var idi. Atama dedim: «Atacan, xeyli vaxtdır buradayıq, kiminçün daha çox darıxmısan?» Mən Kufədəki oğlum üçün darıxdığını düşünmüşdüm, lakin o, «Əbu Hənifə üçün» - dedi.»* [əl-Harisi, *«Kəşful-əsariş-şərifə fi mənaqibil-imam Əbi Hənifə»*, I, 103.]

İmam Əbu Hənifə də şeyxinin bu hörmətini qarşılıqsız qoymamış, Məhəmməd ibn Əban əl-Quraşinin də qeyd etdiyi kimi ona vəfatından sonra da sadiq qalmışdı: *«Mən Allaha dua edərkən ata-anamdan əvvəl Həmmad üçün dua edirəm.»* [əs-Sayməri, *«Əxbar Əbi Hənifə və əshabih»*, 21][5]

Bu şəkildə Kufə fiqhi ən güclü fəqihdən ən güclü fəqihə keçərək əshabədən İmam Əbu Hənifəyə qədər gəlmişdir. Əz-Zəhəbinin də qeyd etdiyi kimi: *«Kufə əhlinin ən güclü fəqihi Əli və İbn Məs'uddur, onların ən güclü fəqih tələbəsi Alqamədir, onun ən güclü fəqih tələbəsi İbrahimdir, onun ən güclü fəqih tələbəsi Həmmaddır, Həmmadın ən güclü fəqih tələbəsi isə Əbu Hənifədir.»* [əz-Zəhəbi, *«Siyər ə'lamin-nubələ»*, V, 236]

### Əbu Hənifənin tələbələri.

Səhabəyə qədər uzanan elmi silsiləsi İraqın ən güclü alimləri olduğu kimi, İmam Əbu Hənifənin tələbələri də o dövrün ən böyük fəqihləri idi. Qazı Hüseyin ibn Əli əs-Sayməri, imamın nəvəsi Qazı İsmayıl ibn Həmmad vasitəsilə Əbu Hə-

---

[5] İmam Əbu Hənifə, öz oğlunun adını şeyxinin şərəfinə Həmmad qoymuşdur. Əbu Hənifənin oğlu Həmmad da öz oğlunun adını İsmayıl qoymuşdur. Çünki atasının şeyxi olan Həmmadın da oğlunun adı İsmayıl idi.

nifənin öz tələbələrini bu cür vəsf etdiyini rəvayət edir: *«(Yaxın) tələbələrim bu otuz altı nəfərdir, onlardan iyirmi səkkiz nəfəri qazı olmağa, altı nəfəri müfti olmağa layiqdir. İki nəfər isə -Əbu Yusiflə Zufəri qəsd edir- qazı və müftilər yetişdirməyə qadirdir.»* [əs-Sayməri, *«Əxbar Əbi Hənifə və əshabih»*, 158]

Əbu Hənifənin qazılıq vəzifəsini icra etdiyi tələbələrindən bə'ziləri aşağıdakılardır:

1. Əbu Yusif, Ya'qub ibn İbrahim əl-Ənsari. İlk dəfə qazıl-quzat (qazılar qazısı, baş qazı) rütbəsini icra edən imam.
2. Məhəmməd ibn əl-Həsən əş-Şeybani. Əvvəlcə ər-Raqqa qazısı olmuş, daha sonra qazıl-quzat vəzifəsini icra etmişdir.
3. Həsən ibn Ziyad əl-Lu'lui. Hafs ibn Ğiyasın vəfatından sonra qısa müddət Kufədə qazı olmuşdur.
4. Əbu Muti, əl-Həkəm ibn Abdullah əl-Bəlxi. On altı il Bəlx qazısı vəzifəsini icra etmişdir.
5. Əbu Amr, Əsəd ibn Amr əl-Bəcəli. Vasit və Bağdad qazılığı vəzifəsini icra etmişdir.
6. Yəhya ibn Zəkəriyya ibn Əbu Zaidə. Mədinədə qazılıq vəzifəsini icra etmişdir.
7. Afiyə ibn Yezid əl-Əvdi. Bağdadda qazı olmuşdur.
8. İbn Məs'udun nəticəsi əl-Qasim ibn Mə'n. Kufə qazısı olmuşdur.
9. Əbu Ömər Hafs ibn Ğiyas ən-Nəxai. Bağdad və Kufədə qazılıq vəzifəsini icra etmişdir.
10. Əli ibn Mushir. Mosul qazısı olmuşdur.

İmam Zufər ibn Huzeylə gəlincə, Əbdülqadir əl-Quraşi onun Bəsrədə qazılıq vəzifəsini icra etdiyini qeyd etsə də [Bax: Əbdülqadir əl-Quraşi, *«əl-Cəvahirul-mudiyyə»*, II, 208], Məhəmməd Zahid əl-Kövsəri bu haqda belə deyir: *«Əbdülqadir əl-Quraşi bu iddiasında İbn Əbdülbərrin «əl-İntiqa» kitabındakı sözünə əsaslanmışdır... Lakin -İbn Hibbanın da qeyd etdiyi kimi- Sivar ibn Abdullah əl-Ənbərinin 138-ci ildən vəfat etdiyi ilə, 156-cı ilin Zülqa'də ayına qədər Bəsrə qazılığına davam etməsi və vəfatından sonra da oğlu Abdullah ibn Sivarın o vəzifəyə gəlməsi, Zufərin Bəsrə qazısı olduğu iddiasını əsassız edir. Bu səbəbdən əl-Quraşi və İbn Əbdülbərrin bu məsələdə xəta etdiyini demək mümkündür.»* [əl-Kövsəri, *«Ləməhətun-nəzər fi siratil-imam Zufər»*, 26.]

Əbu Hənifənin tələbələrinin, xüsusilə dörd məşhur tələbəsi Əbu Yusif, Zufər, Məhəmməd və Həsənin tərcümeyi-hallarına[6] nəzər salan hər kəs, onların İraqın nəhəng fiqhi simaları olduğunu danmaz, digər məzhəb imamlarından fərqli olaraq bu cür böyük fəqih tələbələrin məhz İmam Əbu Hənifəyə nəsib olduğunu inkar etməz. Bu səbəbdən böyük hafiz, İmam Əbu Abdullah əl-Harisi bə'zi məşhur imamların adını[7] qeyd etdikdən sonra belə deyir: *«Bu adı sadalanan şəxslərin heç biri, fiqh, elm və fətvada Əbu Hənifənin tələbələri kimi tələbələrə sahib olmamışdır.»* [əl-Harisi, *«Kəşful-əsariş-şərifə»*, I, 36.]

Hər biri müstəqil müctəhid[8] olan bu imamların, məzhəbin təşəkkülündə və yazılmasında özünəməxsus rolu olmuşdur.

---

[6] Əllamə Məhəmməd Zahid əl-Kövsəri, hər dörd imamın tərcümeyi-halını müstəqil kitab halında qələmə almışdır.

[7] İmam əl-Harisinin qeyd etdiyi böyük şəxsiyyətlər bunlardır: əl-Həkəm ibn Uteybə, İbn Əbu Leyla, İbn Şubrumə, Sufyan əs-Sövri, Şərik, əl-Həsən ibn Saleh, Yəhya ibn Səid, Rabiə ibn Əbu Əbdürrəhman, Malik ibn Ənəs, Hişam ibn Urvə, İbn Cureyc, əl-Əvzai, İbn Luhey'ə, əl-Leys ibn Sa'd, Ubeydullah ibn Amr ər-Raqqi, Eyyub əs-Səxtiyani, İbn Avn, Süleyman ət-Teymi, Hişam əd-Dastuvai, Səid ibn Əbu Ərubə, Huşeym, Xalid ibn Abdullah, Əbu Avanə və Mə'mər.

[8] Müstəqil müctəhid həm üsulda, həm də fiqhdə müstəqil ictihad dərəcəsində çatmış şəxsdir. Şihabəddin əl-Mərcani və Məhəmməd Zahid əl-Kövsəri kimi mühəqqiq alimlər, imamın tələbələrinin müstəqil müctəhidlər olduğunu qeyd etmişlər. [Bax: əl-Mərcani, *«Nazuratul-haqq»*, 193-198; əl-Kövsəri, *«Husnut-təqadi»*, 23-28.]

## HƏNƏFİ MƏZHƏBİNİN YAZILMA ŞƏKLİ



Hənəfi məzhəbinin yazılması dedikdə, az əvvəl adları sadalanan imamlar arasında ən çox ağla gələn İmam Məhəmməd ibn əl-Həsən əş-Şeybanidir. İmam Məhəmməd məzhəbdə ən mö'təbər qaynaqlar külliyyatı sayılan «*Zahirur-rivayə*» əsərlərinin müəllifidir. Bu külliyyata beş əsər daxildir: «*əl-Əsl*», «*əl-Cami'ul-kəbir*», «*əl-Cami'us-sağir*», «*əs-Siyərul-kəbir*» və «*əz-Ziyadət*» əsərləri.[9]

Lakin bu, İmam Məhəmmədin məzhəbi ilk qələmə alan şəxs olması demək deyil. Hələ İmam Əbu Hənifə həyatda ikən onun başçılığı altında, əl-Kövsərinin tə'biriylə «tələbələrindən ibarət elmi hey'ət» məzhəbi qələmə alma vəzifəsini icra edirdi. İbn Əbul-Avvam sənədi ilə Muğira ibn Həmzənin belə dediyini rəvayət edir: «*Əbu Hənifəylə birgə kitab yazan tələbələri qırx nəfər idi, hamısı da böyüklərin böyükləri.*» [İbn Əbul-Avvam, «*Fədail Əbi Hənifə və əxbaruh və mənaqibuh*», 342]

Bu tələbələrdən bə'zilərin adını Əsəd ibn əl-Furatın qeyd etdiyini görürük: «*Əbu Hənifənin kitab yazan tələbələri qırx nəfər idi. Başda gələn on nəfər arasında Əbu Yusif, Zufər ibn əl-Huzeyl, Davud ət-Tai, Əsəd ibn Amr, Yusif ibn Xalid əs-Səmti və bu kitabları otuz il Əbu Hənifə üçün yazan Yəhya ibn Zəkəriyya ibn Əbu Zaidə var idi.*» [İbn Əbul-Avvam, «*Fədail Əbi Hənifə və əxbaruh və mənaqibuh*», 342]

Bu son rəvayət onu göstərir ki, Əbu Hənifə həyatda ikən ən az otuz il ərzində onun fətvaları, eləcə də tələbələriylə müzakirə nəticəsində ortaya çıxan fiqhi görüşlər qələmə alınırdı. Əbu Hənifə və tələbələrinin fiqhi sür'ətini nəzərə aldığımız zaman, bu müddət ərzində nəhəng fiqhi bir divanın əmələ gəldiyini deyə bilərik.

Həmin bu divan təkcə İmam Əbu Hənifənin deyil, onun başçılığı altında tələbələrindən mütəşəkkil elmi şuranın birgə ictihadlarından ibarət idi. Bu isə o deməkdir ki, digər məzhəblərdən fərqli olaraq, Hənəfi məzhəbi şura məzhəbidir. İmam əl-Muvəffəq ibn Əhməd əl-Məkki bu haqda belə deyir: «*Əbu Hənifə, Allah və elçisinə yönəlik dindarlığı gərəyi, öz görüşlərini tələbələrindən ibarət şuraya ərz edər, onların fikirlərini bir kənara qoyaraq təkcə öz ictihadını irəli sürməzdi. O, fiqhi məsələləri bir-bir ortaya atar, tələbələrini yoxlayar, görüşlərini öyrənər və öz görüşünü də bildirərdi. Bəzən bir ay, yaxud daha çox*[10] *həmin mövzuda tələbələriylə münazirə edərdi, bunun nəticəsində qəbul edilən görüşü Qazı Əbu Yusif divana yazardı. Bütün divan məhz bu şəkildə ərsəyə gəlmişdir.*» [əl-Məkki, «*Mənaqibul-imamil-ə'zam*» II, 133-134]

İmam əl-Kövsəri bu rəvayətləri nəql etdikdən sonra, həmin elmi şuranın Əbu Hənifənin rəhbərliyi altında nə cür fəaliyyət göstərdiyini bu cür izah edir: «*Əbu Hənifənin, tələbələrinə fiqh öyrədərkən tətbiq etdiyi özünəməxsus üslubu var idi; bir fiqhi məsələni müzakirə etdikləri zaman o, həmin məsələ haqda bir ehtimal qeyd edərək onu əlindən gəldiyi qədər gücləndirərdi. Daha sonra tələbələrinə bu mövzuda e'tiraz edib-etmədiklərini soruşar, e'tiraz etmədiklərini gördüyü zaman, özü qeyd etdiyi ilk ehtimalı çürütməyə başlar və bu səfər hər kəs ikinci görüşünün doğru olduğuna qane olardı. Növbəti dəfə tələbələrindən yeni bir görüş ortaya qoymalarını istər, bir şey ortaya qoymadıqlarını gördüyükdə isə, özü üçüncü bir görüş ortaya qoyaraq hər kəsin diqqətini bu görüşə çəkərdi. Axırda isə qeyd etdiyi görüşlərdən birinin doğru olduğuna hökm edər və onun doğruluğunu güclü dəlillərlə dəstəklərdi. Fiqh tə'limindəki bu*

[9] Bə'zi qaynaqlarda altıncı kitab kimi «əs-Siyərus-sağir» kitabı qeyd edilsə də, bu əsər imamın ayrıca qələmə aldığı bir əsər deyil, ən doğrusunu Allah bilir.

[10] Bir məsələnin bir ay, yaxud daha çox müzakirə edilməsi, eyni zamanda başqa məsələlərin müzakirə edilmədiyi kimi başa düşülməməlidir.

*üslub, Əbu Hənifə və tələbələrini digərlərindən fərqləndirən bir üslub idi.»* [əl-Kövsəri, *«Husnut-təqadi»*, 13][11]

İmam Əbu Hənifənin vəfatından sonra da bu elmi şuranın müctəhid fərdlərinin görüşləri, Hənəfi məzhəbinin görüşü olaraq qəbul edilmişdir. Bu səbəbdən məzhəb kitablarında imamdan başqa, məzhəbin Əbu Hənifəylə birgə qurucularından sayılan dörd imamın görüşləri də qeyd edilir: Qazı Əbu Yusif, Məhəmməd ibn əl-Həsən, Zufər ibn əl-Huzeyl və Həsən ibn Ziyad. Bu isə o deməkdir ki, məzhəbin «Hənəfi məzhəbi» adlanması, onun təkcə Əbu Hənifənin ictihadlarından, yaxud tərtib etdiyi üsul qaydalarından ibarət olmasına deyil, müctəhidlərdən ibarət elmi şuraya məhz onun başçılıq etməsinə bağlıdır.

Sonda onu da qeyd edim ki, İslam dövlətinin həm ilk, həm də son rəsmi məzhəbi[12] olması, eləcə də hənəfi qazıların çoxluğu, bu məzhəbi daha çox cilalamış və İslam məzhəbləri arasında özünəməxsus mükəmməlliyə yüksəlməsinə kömək etmişdir.

[Bitirməyi nəsib edən Allaha həmd olsun.]

**İstifadə edilmiş mənbə'lər:**

**əl-Buxari**, *«Sahihul-Buxari»*, Dəməşq, «İbn Kəsir» nəşriyyat evi, birinci nəşr: 1423 h./2002 m.

**Əbu Nueym**, *«Hilyətul-övliya və tabaqatul-əsfiya»*, Beyrut, «əl-Fikr» nəşriyyat evi, 1416 h./1996 m.

**əl-Harisi**, *«Kəşful-əsariş-şərifə fi mənaqibil-imam Əbi Hənifə»,* İstanbul, «Məktəbətul-irşad» nəşriyyat evi, birinci nəşr: 1441 h./2020 m. Təhqiqatçı: Lətifurrəhman əl-Bəhraici əl-Qasimi.

**İbn Əbul-Avvam**, *«Fədail Əbi Hənifə və əxbaruh və mənaqibuh»*, Məkkə, «əl-Məktəbətul-imdadiyyə» nəşriyyat evi, birinci nəşr: 1431 h./2010 m. Təhqiqatçı: Lətifurrəhman əl-Bəhraici əl-Qasimi.

**İbn əl-Cövzi**, *«Mənaqibul-imam Əhməd ibn Hənbəl»,* Ciza, «Hicr» nəşriyyat evi, ikinci nəşr: 1409 h./1988 m. Təhqiqatçı: Abdullah ibn Əbdülmuhsin ət-Turki.

[11] Həmçinin bax: [İbn Əbul-Avvam, *«Fədail Əbi Hənifə»*, 111.]

[12] Abbasilər zamanında, Qazı Əbu Yusifin qazıl-quzat olmasıyla Hənəfi məzhəbi dövlətin ilk rəsmi məzhəbi olmuşdur. Həmçinin Osmanlı dövlətinin rəsmi məzhəbi də Hənəfi məzhəbi idi.

**İbn əl-Fəradi**, *«Tərix uləmail-Əndəlus»,* Tunis, «əl-Ğarbul-İslami» nəşriyyat evi, birinci nəşr: 1429 h./2008 m. Təhqiqatçı: Bəşşar Avvad Mə'ruf.

**İbn Hani**, *«Məsailul-imam Əhməd ibn Hənbəl»,* Beyrut, «əl-Məktəbul-İslami» nəşriyyat evi, birinci nəşr: 1400 h./1980 m. Təhqiqatçı: Zuheyr əş-Şaviş.

**İbn Qayyim əl-Cövziyyə**, *«İ'lamul-muvaqqi'in»,* Misir, «əs-Səadə» mətbəəsi, birinci nəşr: 1374 h./1955 m. Təhqiqatçı: Məhəmməd Məhyəddin Əbdülhəmid.

**İbn Quteybə**, *«əl-Məarif»*, Göttingen, 1850, təhqiqatçı: Ferdinand Wüstenfeld.

**İbn Sa'd**, *«ət-Tabaqatul-kəbir»*, Qahirə, «Məktəbətul-xanci» nəşriyyat evi, birinci nəşr: 1421 h./2001 m. Təhqiqatçı: Əli Məhəmməd Ömər.

**əl-İcli**, «Mə'rifətus-siqat min ricəl əhlil-ilm vəl-hədis və minəd-duafə və zikr məzahibihim və əxbarihim», Mədinə, «Məktəbətud-dar» nəşriyyat evi, birinci nəşr: 1405 h./1985 m. Təhqiqatçı: Əbdüləlim Əbdüləzim əl-Bəstəvi.

**əl-Kövsəri**, «Fiqh əhlil-İraq və hədisuhum», Qahirə, «əl-Məktəbətul-əzhəriyyə lit-turas» nəşriyyat evi.

**əl-Kövsəri**, *«Husnut-təqadi fi siratil-imam Əbi Yusuf əl-qadi»,* Misir, «əl-Ənvar» nəşriyyat evi, 1368 h./1948 m.

**əl-Kövsəri**, *«Ləməhətun-nəzər fi siratil-imam Zufər»,* Qahirə, «əl-Məktəbətul-əzhəriyyə lit-turas» nəşriyyat evi.

**əl-Quraşi**, *«əl-Cəvahirul-mudiyyə fi tabaqatil-hənəfiyyə»*, Qahirə, «Hicr» nəşriyyat evi, ikinci nəşr: 1413 h./1993 m. Təhqiqatçı: Əbdülfəttah Məhəmməd əl-Hulv.

**əl-Məkki**, *«Mənaqibul-imamil-ə'zam»*, Heydərabad, «əl-Məarifun-nizamiyyə», qurumu, birinci nəşr: 1321 h./1903 m.

**əl-Mərcani**, *«Nazuratul-haqq fi fərdiyyətil-işa və in ləm yəğibiş-şəfaq»*, Amman, «əl-Fəth» nəşriyyat evi, birinci nəşr: 1433 h./2012 m. Təhqiqatçılar: Orxan Ençakar, Əbdülqadir Yılmaz.

**ər-Ramhurmuzi**, *«əl-Muhəddisul-fasil beynər-ravi vəl-vai»,* Dəməşq, «əl-Fikr» nəşriyyat evi, üçüncü nəşr: 1404 h./1984 m. Təhqiqatçı: Məhəmməd Acəc əl-Xatib.

**əs-Sayməri**, *«Əxbar Əbi Hənifə və əshabih»,* Beyrut, «Ələmul-kutub» nəşriyyat evi, ikinci nəşr: 1405 h./1985 m. Təhqiqatçı: Əbul-Vəfa əl-Əfqani.

**ət-Tahavi**, «Şərh Muşkilil-Əsar», Beyrut, «Muəssəsətur-risalə» nəşriyyat evi, birinci nəşr: 1415 h./1994 m. Təhqiqatçı: Şueyb əl-Arnaut.

**əz-Zəhəbi**, *«Siyər ə'lamin-nubələ»*, Beyrut, «Muəssəsətur-risalə» nəşriyyat evi, on birinci nəşr: 1417 h./1996 m. Təhqiqatçılar: Şueyb əl-Arnautun rəhbərliyində bir qrup təhqiqatçı.

Məqalədəki rəsmlər Tariq əs-Suveydanın *«əl-İmam Əbu Hənifə ən-Nu'man»* kitabından götürülmüşdür.